Azərbaycan Respublikası MEA
Nizami adına Ədəbiyyat İnstitutu
Elmi Şurasının qərarı ilə çap olunur.

**TOPLAYANI, TƏRTİB EDƏNİ,
ÖN SÖZ, QEYD YƏ İZAHLARIN
MÜƏLLİFİ: f.e.n., dos. Hüseyn İSMAYILOV**

**REDAKTOR: Yaşar QARAYEV
Azərbaycan MEA-nın müxbir üzvü**

**RƏYÇİLƏR: f.e.d., prof. Qara NAMAZOV
f.e.n. Oruc ƏLİYEV**

**NƏŞRİNƏ MƏSUL: f.e.n. Əziz ƏLƏKBƏRLİ**

**Miskin Abdal.** Bakı, "Səda" nəşriyyatı, 2001

Bu kitabda xalqımızın uzun əsrlərdən bəri böyük möcüzələr sahibi, bir övliya kimi sitayiş etdiyi, müqəddəs ocağına tapındığı, qüdrətli el sənətkarı, mürşidi Şah İsmayılın yaxın dostu və məsləkdaşı Miskin Abdalın ölməz sənət dünyasının yaddaşlarda qorunub saxlanılan ən dəyərli nümunələri, onun adı ilə bağlı dastanlar toplanmışdır.

**ISBN-5-86874-228-1**

# TANRI MİSKİNİ – HAQQ CARÇISI

***Türkün mənəvi-əxlaqi, dini-ruhani, elmi-ürfani, ədəbi-ictimai, sosial-mədəni dəyərlərinin mürəkkəb sintetik vəhdətinin ən optimal reallaşma faktı kimi Miskin Abdal şəxsiyyəti nadir simalardandır. Beş əsrdən artıqdır ki, onun mənəvi dünyasından gələn tükənməz enerji bir qaynaq olaraq özündən sonrakı dövrlərin ədəbi mühitini həyat işığı, ilahi eşq fəlsəfəsi və coşqun könül tərənnümləri ilə qidalandırıb; sufi aşıq olaraq sazın funksional imkanlarından da maksimum istifadə etməklə Məhəbbətin Eşqə, Təmizliyin Saflığa, Ehtizazın Ekstaza, İdrakın Vəhyə çatmasını, Kamilliyin Həqiqətə çevrilməsini öz müdrik şəxsiyyətində və zəngin yaradıcılığında mükəmməl şəkildə təqdim edə bilib. Bu böyük şəxsiyyətin həyatı, fəaliyyəti, xüsusilə ədəbi yaradıcılığı və sənətkarlığı, demək olar ki, öyrənilməyib. Miskin Abdal ilə bağlı elmi araşdırmaların məhdudluğunu da nəzərə almaqla, sözügedən şəxsiyyətin və onun çoxistiqamətli fəaliyyətinin aşağıdakı kontekstlərdə öyrənilməsi vacibdir:***

***1. Miskin Abdalın şəxsiyyəti;***
***2. Miskin Abdalın sosial statusu;***
***3. Miskin Abdalın sufi statusu;***
***4. Miskin Abdalın sənətçilik fəaliyyəti;***
***5. Miskin Abdalın siyasi fəaliyyəti.***

***Miskin Abdalın yaradıcılığının bütövlükdə sufizm epoxası kontekstində araşdırılması isə öncə onunla şərtlənir ki, hər bir dövrün insanı mütləq öz fəaliyyətində hakim dünyagörüşün diktəsi altında olur. Ədəbi yaradıcılıq da birbaşa dünyagörüşlə bağlı hadisədir. Həmin dövrün (XV-XVI əsrlər) hakim dünyagörüşü ortadoksal islamın və sufizmin[1] əsas müddəaları və təməl prinsipləri ilə şərtlənir.***

---

1. "Təsəvvüf – sufilik hər bir yüksək xasiyyətə yiyələnmək, hər bir naqislikdən uzaqlıqdır" (Əbu Mühəmməd Cəriri).

Təsəvvüf sürəkli şəkildə Allaha ehtiyac və bu ehtiyacı ödəmək hissi və yoludur. Təsəvvüf yolunda birinci mərhələ elm, ikinci mərhələ əmək, üçüncü mərhələ ilahi vergidir. Elm muradı aşkar edir, əmək tələbi müəyyənləşdirir, ilahi vergi isə ümid qayəsinə çatdırır. "Dünya ilahi vücudu əks etdirən güzgüdür, dünya zahiri cəhətdir. Həqiqətə çatmaq üçün zahiri cəhətdən üz döndərib, şəxsən mövcudluqdan xilas olmaq lazımdır. Sufilərə xas olan vəcdə gəlmək meyllərinin məntiqi inkişafı belədir".

Sufi yolu – Ali həqiqət axtarışı yoludur. O, bu yolu başa çatanda özü olur, müstəqil olur. Yəni, onun məqsədi, əslində, özünə çatmaq, özünə qovuşmaqdır.

Materializmcə – dünya göründüyündən artıq deyil. Dünya dünyayla məhduddur, bəsitdir. İdealizmcə – dünya dərk olunduqca böyüyür, ülviləşir, müqəddəsləşir. Dünya dünyadan kənara çıxır. Sufi təfəkkürü materialist dünyasından doğan idealist dünya mənasını, yəni, Ağılla Ruhun qovuşuğunu təsdiqləyir. Əslində, dünyanın mahiyyətini dərk etməyincə, idrakın sonuncu – Haqqa yetişmək mərhələsinə çatmaq olmaz. Bu məqamda dərk olunmuş dünyanın mənasının özündən böyüklüyü görünür və Haqqa yetişdə Ali Vəcd, Ali Ehtizaz, İlahi Vəhy iqtidarına sahib olunur.

Sufi fəlsəfəsi İnsan aqibətini şərh, təhlil və təyin edən müdriklikdir. Bu fəlsəfi cərəyan təkcə araşdırılmalı deyil, inkişaf etdirilməlidir. Bu təfəkkür insanı fasiləsiz olaraq İdeala – Haqqa yaxınlaşdırır. Ruh dünyaya sığmır, dünyadan yüksəkdə dayanıb, onun mənasından danışır. Bu fəlsəfədə Haqq arzu olunanın, istənilənin Ali Təzahürüdür.

Təsəvviif 4 mərhələdə, 40 məqamda Məqsədə gedən yoldur:

1.Şəriət;

2.Təriqət;

3.Mərifət;

4.Həqiqət.

Birinci mərhələdə din tərəfindən qəbul edilmiş qanun və vəzifələr yerinə yetirilir. İnsan bu mərhələ ilə özünü nizamsızlıqdan qurtarır. Əslində, şəriətin müəyyən dərəcədə gətirdiyi xof – əqlin xilafınadır. O, hər şeyin səthini duydurur. Şəriət özü insanı zahiri davranış vasitəsi ilə Allaha sevdirən bir yol kimi – mistik xəyalpərvərlik, ekstaz və vəcd vasitəsi ilə Allaha yaxınlaşdıran digər yolun – Təriqətin on mərhələsi deyil, əksidir, qarşıduranıdır. Şəriətin şərtləri – iman, elm, namaz, zəkat, oruc, həcc, cahad, sünnət, şəfqət, heyz və cinsi əlaqələrin haramlığı, naqislikdən xeyir əmələ yetməkdir və s.

Bəktaşilik təriqətinin ideoloqu – orden başçısı Hacı Bəktaşi Vəli qulun Tanrıya yetişdiyi qırx məqamı bu cür sistemləşdirmişdi.

İkinci mərhələ sufizmin əsas, mənəvi cəhətdən artma, daxili özüylə döyüş mərhələsidir. Təriqət – yol deməkdir. Yolun uzunluğu təsəvvüf yolçusunun öz qüdrətindən asılıdır. Təriqət hallar və məqamlar silsiləsində bütövləşir.

Məqam – kamillik mərtəbəsidir.

Hal – hər bir məqamı, mərtəbəni tamamlayan, yolçunu yeni məqamlara hazırlayan və nəhayət, Haqqa qovuşduran ilahi vergidir. Hal qəfil gəlir, ani olur. Məqam sabitdir, tam psixoloji vəziyyətdir.

Ozünəhesabat, özünənəzarət və daxili müşahidə – hal və məqamlardır. Sührəverdiyə görə, hər hansı bir halın məqama çevrilmək imkanı var. İlahi vergilər tükənməzdir, məhdudluq yalnız onun hər bəndə tərəfindən qavranılmasıdır. Sufi o qədər kamilləşməlidir ki, sağkən təlqin və hallarla öz Ruhunu öz cismindən çıxarmağı bacarsın!

Təriqət – təmizlənmələr, təblər, vəhylər silsiləsidir. Sufi mütəfəkkir Əl-Qəzali deyirdi: “Şəriətə hamı əməl edə bilər. Əsl çətin yol təriqətdir. İnsan öz nəfsini paklaşdırdıqdan sonra yeni bir məqama qədəm qoyur – sidq və səmimiyyət zirvəsinə yüksəlir.

Təriqətin şərtləri – bəd əməllərə tövbə, mürid olmaq, təraş və sufilərə xas birçək, geyim-xirqə, nəfssizlik, məqam sahibi, məhəbbət sahibi olmaq, eşq, şövq, səfa, fakirlik yiyəsi olmaq, dərviş geyimləri – səccadə, təsbeh, iynə, əsa və s. özündə gəzdirmək, ümid etmək, paklanmaq və sairdir.

Bu mistik yolda sufilərin özünü təhsili – hücrə mehrab üsulu əvəzsizdir. Özünütəhsil fərdi proses olmalıdır. Zahiri təhsil ixtisasçılığa xidmət edir. Heç bir məktəb İnam, İdrak, Mənəviyyat, İradə vermir.

***İslamın əsas müəddəası – "Allahdan başqa Allah yoxdur" (La ilahə illəllah) bütün müsəlman arealında dominant tezis kimi qəbul olunur. Sufi redaksiyası isə Tanrıya (Allaha) münasibəti "Allahdan başqa heç***

---

Özünütəhsil, özüylə döyüş əsl Kamil İnsan yaradır. Sufizm təriqətində İnsan şəraitdən güclüdür. Ən pis şəraitdə ən yaxşı insan olmaq olar. Özüylədöyüşün son nəticəsi Saflıq gətirir. Əsl sufinin Mahiyyəti Təzahürünə bərabər olmalı, mənəviyyatı Əməllərində zöhr etməlidir. Sufilər yaradıcılığı mövcudluğa bərabər olanlardır. Şah Xətai kimi! Şeyx Şamil kimi!

Təriqət yolçusu şəhvətin cismani nəşəsevərliyindən xilas olmalıdır. Eşqi ülviləşdirib, cismanilikdən çıxarmalıdır. Eşqin İlahi mahiyyəti onu sarsıtmalıdır. Gözəlliyi ilahiliyin cismani təzahürü kimi müqəddəs saymalıdır (Nəsimi Aşiqliyi ilə Vaqif şəhvaniliyi hüdudsuz ayrılıq təşkil edir. Çünki, Nəsimi sufi-hürufidir!). Gözəlin köynəyinə Kəbə örtüyü kimi səcdəyə duran Ələsgər bu Eşqin abdalı, quludur. Təriqət yolçusu gözün gördüyü zahiri gözəllikdə, idrakın sevdiyi daxili gözəlliyin vəhdətini axtarmalıdır.

Üçüncü təsəvvüf mərhələsi mərifət adlanır. Nadan şərhçilər sufilərin hadisəyə passiv, hərəkətsiz münasibətindən, bütün ümidləri taleyə, təvəkkülə bağladıqlarından, sufiləri fatalist, mütləq zərurəti Allaha bağlayan, "bəlaya aşiq olan" fanatiklər, dəlilər adlandırırlar. Dayazlar, mahiyyətsizlər, – kamil sevgini, kamil təfəkkürü olanları, "mərifət elmindən dolu" olanları dəli – məcnun adlandırırlar. Füzuli deyir:

**«Eylə sərməstəm ki, idrak etməzəm dünya nədir?<br>Mən kiməm, saqi olan kimdir, meyi-səbha nədir?».**

Ağlın, idrakın bu ucalığında onun anlayıb-bilmədiyi şeylər həmin xırdalar, xəbərsizlər, nadanlar, mərifətsizlərdir. Füzuli öz məcnunluğu ilə dayazlıqları rədd eləyir. İnsanda fikri qüvvə yoxsa, təhlil, tədqiq haradan olsun? Müdrikliyi, müdrik kəlamı pisləyən adam üzürlüdür, neyləsin, anlamır, ona qaranlıq görünən hər şeyi pisləyir. Mahiyyəti tam Təzahürə çevirmək istəyən Sufi mühitə – həyatlaşmağa mane olan mühitə qarşı durmalı, mühitdən imtina etməlidir. Mərifət məqamları daxili təkan və bu mübarizədə qüdrət və iradə tərbiyə edir.

Mərifət məqamlarında Sufi daxilindəki miskinliklə, zəlilliklə, köləliklə döyüşüb, Tanrı miskininə, Tanrı quluna, İlahi Eşq xəstəsinə çevrilir.

Özünü dərk edən Sufi deyir: "Mən dünyaya yeyib-içməyə, nəsil artırmağa, ölməyə gəlməmişəm. Mən mənim dünyamı dərk edib, Ali İnsani Kamilliyə çatıb, sonsuz olmağa, müqəddəsləşməyə – Aqibətim deyirəm. Mərifət mərhələsi ilahi güc və bilik verir.

Sonuncu – 4-cü mərhələdə təsəvvüf yolçusu Ucalar ucası qarşısında zərrəyə döndüyünü və bu Ucalığın bir Zərrəsi olduğunu dərk edir, sirlər onun qarşısında pünhanlığını itirir, kamilliyə-pirliyə yetişən sufi "mülk sahibinin ətəyinə üz qoyur", işıqlanır, nur saçır, vəhylər, ehtizazlar, vəcdlər içində Bəxtiyarlığa və Sonsuzluğa qovuşur. O, İlahi Eşqinə minacatlar deyir. İlham bədahətən, fasiləsiz çuğlayır onu. Bu, Həqiqətə qovuşma mərhələsinin möcüzələridir.

Xirqə geyinmiş, adi insani tələblərdən belə, rifahından, dünyəvi həzzlərdən imtina edən təriqətçinin özündən keçməsi – özündən yüksəkdə zühur etməsinə gətirib çıxarır. O, özündən kənardakına can ataraq, özünü cismani əzablara salır və bu əzablar – "bəlayi eşq" ona həzz verir. Haqq Aşiqinin istedadı fədakarlıq, əzab və işgəncəyə tab gətirməkdir. Göysevər Aşiqin Həqiqəti – o göylər Sahibinə qovuşmaqdır. (Hacı Bəktaşi Vəli "Məqalət", Ankara, 1990; Z.C.Məmmədov "Azərbaycanda XI-XIII əsrlərdə fəlsəfi fikir", Bakı – 1978).

*nə yoxdur" müddəasında ifadə edərək, hər şeyin ondan yarandığını və hər şeyin ona dönəcəyini (İnna lillahi və inna ileyhi raciun) məhz "Qurani-Kərim"in özündən çıxış etməklə din üzərində, onun əsasında fəlsəfə yaratdı. Bu fəlsəfəyə görə, Tanrıya qovuşmaq, (Vəhdəti-vücud) onda ərimək (fənafillah), mürəkkəb vəhdətin – tamın üzvi hissəsinə çevrilmək üçün ürfani davranışların xüsusi funksional modelləri, təlimləri və qaydaları vardır. Sufi kontekstində "miskinlik və abdallıq" da xüsusi ruhani davranış kateqoriyaları kimi çıxış edir. Bu kateqoriyaların bir şəxsiyyəti ad səviyyəsində simvollaşdırması (iki kateqorial terminin bir şəxsiyyətə aid olması) o deməkdir ki, həmin kaqetoriyaların ("miskinliyin " və "abdallığın") həm sosial kontekstdə, həm də mətn kontekstində xüsusi differensial funksional semantikası vardır. Funksional semantika iyerarxiya təşkil etmir. Yəni, "miskinliyin" və "abdallığın" işarələdiyi anlayış, məna, bir-birini əvəz edə biləcək vahidlərin münasibəti (paradiqmatik münasibət) səviyyəsində deyil. Əksinə, onlar arasında ardıcıllıq (sintaqmatik münasibət), səbəb-nəticə (determinativ) əlaqəsi vardır. "Fənafillah" səviyyəsinə yüksələn, ali məqama yetişən Miskin Abdal Tanrı həqiqətini anlamaq yolunda "miskinləşmiş", "qullaşmış", "zəlilləşmiş", Haqq carçısına çevrilərək, "Abdal" adını almışdı.*

*Həm öz zəmanəsinin, həm də bizim zamanın gözlədiyi adam – fiziki ömrü (1430-1535) 105 il, mənəvi ömrü isə tükənməz olan Seyyid Hüseyni dünyaya Ulu Göyçə bağışlayıb. Mahalın Zərgərli (indiki Sarıyaqub) kəndində Cəfər oğlu Məhəmmədin ailəsində doğulub. Hüseynin mənsub olduğu "Zərgərli" tayfasının ağsaqqalları şiəliyin yayıcıları kimi, o cümlədən, hörmətli, izzətli, ağıl sahibləri olduqları üçün Göyçənin hüdudlarından xeyli uzaqlarda tanınırdılar. Tarixi faktlara görə, Hüseynin ulu babası Yaqubla Səfəvi şeyxləri arasında sarsılmaz inam və əqidəyə söykənən qırılmaz dostluq əlaqələri olmuşdur. Şeyx Səfi ilə Hüseynin beşinci babası Yaqub arasında yaranan mənəvi yaxınlıq sonralar hər iki nəslin törəmələri tərəfindən daha da inkişaf etdirilib. Miskin Abdalın ulu babaları İbrahim, İsmayıl, Əli, babası Cəfər və atası Məhəmməd Ərdəbil şeyxlərinin ən sınanmış müridləri kimi, Göyçədə sufiliyin*

*təriqət ideyalarının yaranmasına hamilik edirdilər. Hüseyn də belə bir müqəddəs nəslin daşıdığı böyük tarixi və mənəvi-dini missiyanı ləyaqətlə davam etdirmiş, Şeyx Heydərin yaxın dostu olmuşdur.*

*Vahid, yekcins təlim olmayan sufizmin Göyçədəki qoşa sistemli "bəktaşilik" – "ələvilik" təriqətləri Seyyid Hüseynin babaları tərəfindən rəhbərlənmişdir. Adi dindarlıqdan böyük həqiqətə aparan təriqət konsepsiyasının nəzəri əsasında insanın Allahla şəxsi xüsusiyyətə yüksəlməsi, dünyanın Allahdan emanasiya edilməsi dayanırdı. Məhəmməd Peyğəmbərin və IV xəlifə Həzrəti Əlinin islam dinində sufizm doktrinasına tərəfdarlıqları[1], xüsusilə, şiəliyin yayıldığı ölkələrdə bu prosesə güclü təkan verdi. Göyçədə bəktaşilər "Əql və Mühakimə" məclislərində dünyanın əbədiliyi, səbəbiyyət nəzəriyyəsi problemləri barədə kəskin mübahisələr açır, dini-fəlsəfi, etik mövzularda günlərlə davam edən "Söz cəngi" yığnağı keçirirdilər (Aldədənin nəvəsi, el şairəsi Sona xanımın söylədiklərindən).*

*Bizə arxaik görünən keçmiş tariximizdə Göyçə kimi ucqar bir mahalda sufilərin, təkcə dini-etik deyil, kosmoloji, sosioloji konsepsiyaları təhlil edən fikir mübadilələri, Göyçədəki Tusi dağında münəccimliyin sirrlərini açan Nəsrəddin Xocanın öz müridləri ilə təşkil etdiyi dini-elmi məclisləri tədqiqsizlik ucbatından tarixin qaranlıq qatlarında ən dəyərli xəzinə kimi gizlin, qapalı qalmışdır. Göyçə sufi təriqətləri öz xüsusi ideya prinsipləri, təbliğ və təlim üsulları, keyfiyyət çalarları ilə spesifikdir. Göyçədəki bəktaşilikdə çox güclü bir səfəvilik vardı; musiqi və şeir praktikasında isə mövləvilik ruhu hakimdi. Miskin Abdal – Seyyid Hüseyn, əlbəttə, ayrıca bir təriqət yaratmadı. Onun ideyasında şəriət-təriqət ayrımı yox idi. Miskin Abdal təfəkküründə İnsan aqibəti fasiləsiz olaraq İdeala – Haqqa yaxınlaşır. Ruh dünyaya sığmır, dünyadan danışır. Tanrıya yaxın məqamda Göyçədə bəktaşiyyədən gələn "əhli-həqq", yasəvilikdən gələn səfəviyyə təriqətləri bir İlahi təntənə yaratmışdı.*

--------------------

1. Петрушевски И.П. "Про суфия". стр.320.

*Miskin Abdala qədər Göyçə sufi ədəbiyyatına:*

*"Dərsini pirdən almasa,*
*İbrahim Ozana yetməz."*

*və ya:*

*"Miskin vücudumda daim var olan*
*Sevgidən qurduğun tora gəlməzmi?" –*

*deyən Ozan İbrahim,*

*"Gözlədiyim haqqın köçü,*
*Ölüm həsrəti, həsrəti,*
*Barilahim kənizinəm,*
*Qulun həsrəti-həsrəti" –*

*deyən havata – sufi qadın, zodlu Fatimə Xatun və s. sufiyanə deyimlərə özək yaratmışdılar.*

*Lakin Miskin Abdal Aşıq – Aşiq Sufi ədəbiyyatının ənənəvi binasını qoydu. Təriqət ideologiyası ilə ədəbiyyata, aşıq sənətinə büllurluq, müqəddəslik gətirdi. Məqamlarda yaranan Halın bədii ifadəsi olan poeziyanın əfsunu sehrli Aşiqin – Aşığın könül tərənələri sazın pərdələrində Ali izharını tapdı. Nəsillikcə Müsəmma Miskini, Miskincəli Miskini, Miskin Məhəmmədi yetirən Zərgərli şəcərəsinin Mövlana Miskin Abdalı – Ruh memarı, Haqq bülbülü idi! Tədqiqə sığmayan və tədqiqinin sonu olmayan İlahi Eşq Dəryası idi Miskinimiz!*

*Şəriətin – iman, elm, namaz, zəkat, oruc, həcc, cahad, sünnət, şəfqət və s. şərtlərindən təriqətin – təmizlənmələr, təblər, vəhylər aləminə aparan ən müşkül və çətin yolunda Miskin real praktik vasitə – şeir və musiqini görürdü. Nəfsi paklaşan insanın yeni bir məqama – sidq və səmimiyyət zirvəsinə qoyacağı qədəm məhz Saz və Sözün ilhamı, vəcdi, katarsisi ilə mümkün olacağını gördü. Türkün qopuz havaları "yeletmələri" çölləmə idi, qəlibsizdi. Oğuz söyləmələrinin uyarına, ahənginə çalınırdı. Saz isə ritmikdi, vəzn, ahəng, təqt-rəvanlıq tələb edirdi. Miskin türk-at-sazla söz-ritm- avazın birliyinin möhtəşəm gücünü görürdü.*

***Ozündəıı çıxmaq, cismindən ayrılmaq qəhrəmanlığını təsdiqləyən Saz yeni ruhlu Miskin könlündən daşıb gələn havaları izhar etməklə Göyə, Haqqa dartınır, diz üstündən yuxarı – sinəyə, başın fövqünə qalxırdı. Yerdəki dərdlərin dərmanını Göydə arayırdı Ulu Miskin! Bu iztirablı səslərin son qiyməti Kamillikdi! Sazı dizdən sinəyə qaldıran qüvvə – Qüdsi Mahiyyətə çılğın sevgi, cuşa gəlmək, hədəqədən çıxmaqdı. Bu möcüzə aləti tutiya kimi yuxarı qaldırıb, Eşq Nəğmələrini Göylərə xitab etmək coşğunluğu idi! Söz Aşiqdən süst oturaqlıq yox, qaynayıb-daşmaq, sinkretik bir məharət tələb edirdi. Miskinin sufi dünyasında gözəl səs musiqiləşir, gözəl söz şeirləşirdi. Bu şeir və musiqinin mayasında isə Haqq dünyasının ideyaları yaşayır!***

***Miskin Abdal Ruhu cismani tələbatın hökmündən xilas etməyə kömək göstərən vəcdə gəlmək və özüylədöyüş, özünüidarəyə nail olmaq üçün aşıq poeziyası və musiqisindən istifadə edilməsi qaydalarının mürəkkəb sistemini yaratdı.***

***Tanrı Eşqinin sonsuzlaşması, çılğınlaşması, dəliləşməsi Seyyid Hüseyni müdrikləşdirdi. Sevdiyi Haqqın səcdəsində kiçilib, miskinləşdi (Hakimə səcdə qılmaq insanı kiçildir. Haqqın səcdəsində miskinləşib, zəlilləşmək isə onu Haqqa ucaldır).***

***Saz – Sufi ekstransında – ekstaza və Vəhyə aparan yolda sənətkar Miskinin körpüsüydü (sehirli nəqliyyatıydı). "Miskin" sözünün sufi təriqətdə daşıdığı konkret mənanı anlamayan diletant sensasiya həvəskarları bu kəlməni özü üçün təxəllüs seçən bütün şairləri, hətta bu sözü özündə daşıyan, yer, yurd adlarını Miskin Abdalla bağlamağa cəhd göstərir, bundan öz məqsədləri üçün bəhrələnməyə çalışırlar.***

***Miskin Əsəd, Miskin Əli, erməni aşığı Miskin Bürcü və s. Hətta bu təxəllüslə gürcü aşıqlarının da şeirlər yazdığı məlumdur. Miskin Abdaldan xeyli əvəllər yaşamış Yunus İmrə də tez-tez bu təxəllüsə müraciət etmişdir. Şah İsmayıl Xətainin də çox sevdiyi və dönə-dönə üz tutduğu ədəbi təxəllüslərindən biri Miskin olmuşdur.***

***"Miskin " sözünün leksik mənasından fərqli öz ilahi eşqi naminə nəfsini boğaraq, mənəvi ucalığın zirvələrinə, pir məqamına qovuşmaq "miskinliyin" simvolik açarıdır. Təriqət şairlərinin xalq***

*arasındakı böyük şöhrəti miskin sözünün leksik mənasını arxa plana keçirərək, bu ifadənin yeni simvolik məna daşımasını təmin etmiş, onu qüdrətli sənət və sənətkar anlayışlarının sinoniminə çevirmişdir.*

*Miskinin məğlub olan bədəni, qalib gələn Ruhu onu həqiqətin on doqquzuncu pilləsində Abdallaşdırdı. Özündən kənarda öz böyük dünyasını tapıb, öz cismani mahiyyətini gördü. Ümmilər, əxilər, əfradlar, əmradlar kamilləşən; fakirlər, nəbilər, saliklər, məqamlarda aliləşən qələndərlər, dədələr, irşadlar, müftilər, çələbilər, övliyalar, müridlər, mürşidlər Miskin Abdaldan aşağıda qaldı. Abdallıq – Şeyxlik, Pirlik mərtəbəsiydi. Bəndənin özünü zərrə saydığı və Həqiqətdə Tanrının substansiyasına, özünə qovuşduğu məqamdı.*

*Miskin Abdal zaviyələrdə zahidliyin düşməni idi. Mötədil islam inkvizisiyaçılarının qənimi idi. O, şəraitin gətirdiyi xofdan uzaq idi. O, səthi qanun köləliyindən uzaq idi. O, məqamların tam psixoloji və vəhylənmə anlarının köləsi idi.*

*Sufiliyin ən ağrılı, ən əzablı, məsul və mötəbər mərhələsi olduğundan o, sufi miskinliyi ilə abdallıq mərtəbəsini qovuşdurub, bu adla yaşamağı özünə şərəf saydı.*

*Rəfiq Özdək "Türkün qızıl kitabı"nda yazır: "Orta Asiyada Alp-ərənlər, Anadoluda "Babalar", "Abdallar" və "Qazilər" vətənə xidmət edən rəhbərlər olmuşlar"[1].*

*«İslam ensiklopediyası»nda isə "abdal" sözünü görkəmli türk alimi Fuad Köprülü belə açıqlayır: "Abdal" sufiliyin mərtəbə silsiləsindəki dərəcələrdəndir. Təsəvvüfə dair əsərlərdə bu mərtəbənin xüsusiyyəti və təfərrüatı haqqında mütəbakat yoxdur. Ən çox yayılmış bir qənaətə görə, qırx olan abdal – övliya mərtəbə silsiləsində sonuncu dərəcəni təşkil edir ki, bu silsilənin zirvəsindədir"[2].*

*Haqq şahı, Haqq aşiqi – "haqq ilə sirdaş olan" Şah İsmayıl Azərbaycanın şimalına yürüşlərə hazırlaşarkən, qoşun sərkərdələri ona Göyçə mahalından keçməyi məsləhət görürdülər. Çünki, Səfə-*

---

1. Rafiq Özdək. Türkün qızıl kitabı. Bakı. 1993. s. 103.

2. İslam ensiklopediyası.

*vilərin yaxın dostları, inanılmış müridləri artıq bu ərazidə qızılbaş sufi təriqətinin yerli əhali tərəfindən qəbul edilməsi üçün möhkəm zəmin yaratmışdılar. Həm də bir vaxt Ağdamar qalasında gizlədilən yeniyetmə İsmayıl ("Divani Şah İsmayıl – aləm arayi"; 125-ci vərəq) Göyçə meşələrində keyik, ayı ovuna çıxıb, yalçın qayaların, uca zirvələrin yalında köhlən oynatmışdı.". "Ayı ovu" miniatürü məhz Göyçədə 13 yaşlı İsmayılın ov mərasiminə həsr olunub. Dərin köklər, mənəvi tellərlə Göyçəyə bağlı olan Şah Xətaini göyçəlilər artıq təriqət şahı kimi qəbul etmişdilər. Qalırdı, onun bir hökmdar kimi qarşılanması. Sarıyaqub kəndində yaşayan və Göyçə hüdudlarından dışarıda da müqəddəs övliya kimi tanınan Miskin Abdal bu vəziyyəti çoxdan hazırlamışdı. 1500-cü ildə Miskin Abdal gənc Səfəvi sərkərdəsini Göyçədə böyük ehtiram və sonsuz məhəbbətlə qarşıladı. Bu görüş onların hər ikisini sevindirdi.*

*Eşqin, Səfanın, Vəcdin qasidi, daşıyıcısı Miskin Abdal Şaha Saz bağışladı. Miskinlə Şahlığın qovuşuğunu yaratdı. Bu müqəddəs təntənə, məhz Haqqın dərgahı Göyçədə olmalıydı. Şeyxanə Miskin Abdal Şahlıq camını öz əlləri ilə içirtdi fatehlər fatehinə. Saz və Şahlıq butası! Bu birlik Sazın-sözün və şəxsiyyətin birliyində öz qızılbaş müridlərinin mübarizlik ruhunu coşdururdu. Sufilikdən gələn yenilməzlik, Vətən sevgisi, sədaqət keyfiyyətlərindən qələbə vəcdi yaratdı, hücumlarda, döyüşlərdə şeirin, sazın verdiyi möcüzə döyüş ilhamından Böyük Azərbaycanı bərpa etmək üçün istifadə etdi. Şah Xətainin Sufi Mahiyyətinin, onun əzəli, əbədi mənasının təsdiqi yarıbayarı Miskin Abdal dərslərindən, şeyxlik təlimlərindən, şahda doğurduğu heyrət və məhəbbətdən doğurdu. Məhz, buna görə də, Şah Xətai tarixin həmişə zirvədə qalan taxtında fateh kimi, şahənşah kimi, öncə isə İradə qəhrəmanı kimi, mürşid Pir kimi əyləşib. Miskin Abdalla Şah İsmayılın rəvayətlərə, dastanlara çevrilən görüşü tarixdə Böyük Azərbaycan üfüqlərinin açarına çevrildi. Miskin Abdalın tövsiyələri ilə hürufi şairlər Qızılbaşlara qovuşdular. Əvvələr amansız şəkildə təqib olunan hürufilər indi öz himayəçiləri, mövlana Miskinin müridi Şah İsmayılın dövrünü "Mehdiyi–Sahibi zaman" dövranı kimi qiymətləndirirdilər. Xətai yolunda asılan Pir Sultan Abdal, Qayğusuz Abdal, Qul Himmət Miskinimizi öz ustadları sayır, Xətai məsləkinin tərənnümündə ustadlarına alqışlar*

*yağdırırdılar[1]. Şahıyla yayı Göyçədəki iqamətgahda, qışı Ərdəbildə keçirən ustad onu övladlarından artıq sevirdi.*

*Şah İsmayıl Xətainin rəsmən səlahiyyətli vəziri, dövlətlərarası diplomatik əlaqələr işinə rəhbərlik edən Seyyid Miskin Abdal idi.*

*O, Sultan Səlimin "qüdrətli islam dövləti" yaratmaq şüarı altında cinayətkar müharibələrinə diplomatik sufiyanə etiraz edirdi:*

*"Canım qoydum mürşidimin yolunda,*
*Sərgərdan qalmışam Urum yolunda,*
*İslam bada gedir cəllad əlində,*
*Paşam, mürvət elə, belə kar olmaz".*

*Miskin Abdal Şah Xətayi şərəfinə saysız qoşmalar, şərəfnamələr qoşdu. Dövlətlərlə ən barışmaz müşkülatı pir ovsunu, kəraməti ilə həll etməyi bacaran Miskin Abdal bədahətən söylədiyi, düzüb-qoşduğu şeirlərdə qalib çıxan böyük bir qoşunu əvəz edirdi.*

*Şahımız isə şeirin və musiqinin İlahi gücünü pir zəkası ilə təyin edə bilirdi. Onun sarayında ən nüfuzlu şəxs şair idi; Miskinimiz alim idi; Miskinimiz Şeyx idi; Miskinimiz çalğıçı başıydı (musiqiçiydi).*

*Miskin Abdal Şahımız şərəfinə Saz və Söz "Divanilər"i yaratdı. "Şahsevəni", "Şahqalxdı" saz havalarını ona şərəfləndirdi. Özüylə Göyçədən seçib, Ərdəbilə – Şah Xətainin sarayına gətirdiyi 12 aşığa, həm də xalq ədəbiyyatının "varsağı" oynaq havacatlarını da ifa etdirməyi məsləhət gördü (Yəqinləşdirməliyik ki, "Varsaqlıq " aşıq sənətində mərhələ deyil, sənət növüdür və bu gün də varsaqlıq Şirvanda daha güclüdür).*

*Təriqət ədəbiyyatının gətirdiyi Haqq aşiqliyi, Nəsimi, Xətai, Füzuli eşqi, dastana, ədəbiyyata, poeziyaya dönən eşq butaları Aşiqliyi artırmışdı, alovlandırıb, zirvələşdirmişdi. Aşiq – yəni, eşqə düşən öz sevgisindən söz qoşub, saz çaldı. Bu Eşqin ən dəqiq tərcümanı*

1. N.E.Sadeddin. Xətai divanı. İstambul, 1956.

*Saz ola bildi! Türkün ”Aşk”çısı Miskin Abdalın simasında əsl Haqq aşığına çevrildi. Tanrı Aşkçısı – Haqq aşığı Miskin Abdalın sinəsi haqqın bazarı idi. Onun ilahilərində, minacatlarında, qoşma, gəraylılarında dini-fəlsəfi idrak işıq saçır. Miskinə görə, Maddi Ruh – heyvani Ruhdur. Heyvani Ruh hiss və hərəkət qüvvəsinin daşıyıcısıdır, cismanidir. O, damarların içərisində yayılır. İnsani ruh isə İlahi aləmdən gəlir. Bu Ruhlar qovuşur. İnsana Nitq və İlham verir.*

*Ruhi sevgi mələksevərlikdi. Heyvani sevgi ötəri və sonu qaranlığadı. Miskinimizdə sevgi çoxluğu, həzz işığı – fiziki puçlaşmadan, zillətdən güclüdür. Bu sevginin çoxluğunda nəfs bədənə tabe deyil:*

*“Yazıq könlüm, nə sızlarsan, bülbülə tay olmusan,*
*Haçan yardan yarımısan, sevilib bay olmusan?..*
*Sən dərvişsən, Haqq yolunda, Haqqı istə, Haqqı sev,*
*Nə olsun ki, bel bükülüb, kamana tay olmusan “.*

*Şah Xətai Ulu Miskinin bu Eşq Şəhadəti qarşısında diz çökdü:*

*“Ya ilahi, sən məni bi eşqi canan eyləmə,*
*Eşqilə şadəm, dəxi dərdimə dərman eyləmə!” –*

*nəzirəsini yazdı. Miskindən başlanan bu şəhadətlik şəcərəsi əsrləri riqqətə gətirən, məşhur –*

*“Ya Rəbb! Bəlayi-eşq ilə qıl aşina məni,*
*Bir dəm bəlayi-eşqdən etmə cüda məni” –*

*deyən Füzuli qurbanlığı yaratdı. Miskin Abdal miskinliyi sufi yolunun mərifət mərhələsində qazanmışdı. Bəktaşiliyin şərq cərəyanlarında “qorxu” mərhələsi bu məqamdan sonra gəlir. Lakin bu məqam Göyçə sufi çalarına, məktəbinə yad idi. Kökü Oğuzlardan olan sufi – Göyçəli Seyyid Hüseyn Sevgiçidi! Qorxan deyil. O, qorxuları sevir – göyün mübhəmliyini, gedər-gəlməzliyi, şimşəyin kəsərini sevir.*

*Mövlası buta verdiyi Sənubərin eşqində kamilləşir. Tək Sənubəri yox, onun Xaliqini sevir. Xaliqin zərrəsi olan Sənubərə qovuşmaq əzmində fəda olurdu.*

*Onun ehtizazında Kamillik zəhmli görünür. Ağıl məhvərindən çıxır, bədən unudulur, fiziki təlqin möcüzəli bir hala yetir. Xalisləşir, ölümsüzləşir. Bu təlqin idi həyatı qasırğalarda, məhrumiyyətlərdə keçən Seyyid Hüseyni 105 il qoruyub, yaşadan (qəribə tale oxşarlığıdır ki, Aşıq Ələsgər də 105 il yaşadı).*

*Miskin Abdal Şah sarayında nüfuzlu, hörmətəşayan bir dövr yaşasa da, Bağdadda, Şamda, Dağıstanda, Azərbaycanın bəzi vilayətlərində siyasi missiyaları həyata keçirsə də, yüksək diplomatik məharətinə mükafat olaraq, yaşadığı Sarıyaqub kəndi ona bağışlanıb, ətrafdakı beş kəndin vergisi Şahın xüsusi fərmanı ilə onun üçün ayrılsa da (hər iki sənəd 1820-ci ildə Göyçənin Çaxırlı kəndinin kəndxudası tərəfindən bir daha yenidən rəsmən təsdiq edilib), bu bəxtəvər sufi mürşidinin, şah vəzirinin şəxsi həyatı o qədər də işgəncəli və faciələrlə dolu keçib. Cavankən butasının sevgilisinin faciəvi ölüm dağını alan Miskin Abdal Dağıstanda şahın ona tapşırdığı diplomatik missiyanı yerinə yetirərkən ata-anasının ölümündən xəbər tutur. Şahın icazəsi ilə ailəsini götürüb, Göyçəyə yola düşür. Qış zamanı Dağıstan dağlarında borana düşən Miskin Abdal iki oğlunu itirir. Gözü yaşlı sufi mürşidi boranlı dağlara üz tutub, üzüntüsünü bildirir:*

*«Gözü yaşlı qoydun Cüda Miskini,*
*Eylə gülə-gülə tamaşa, dağlar!» –*

*deyib, inildəyir, nalə və fəryad qoparır. 1514-cü ildə Çaldıran savaşında ağır yaralanan Miskin Abdal ən dəhşətli sarsıntını Şah İsmayıl Xətainin ölümünü eşidərkən keçirir. Həqiqətdə – Ruh dahiləşir. Onun hissi aləmlə mübarizəsi başa çatır.*

*Haqq şahı, Haqq Aşiqi idi – "Haqq ilə sərdar" olan Xətai (Bu gün ölkə parçalanıb, kiçildikcə – dərdi bütövləşib, böyüdükcə – amansız ehtiyac duyuruq sufiliyə, müridliyə, sərdarlığa). Ali Sufilər özlərini tarixdə təsdiq etdilər. Şah Xətai tarixin həmişə zirvədə qalan taxtında Fateh kimi, Şahənşah kimi, öncə isə İradə Qəhrəmanı, mürşid Pir kimi əyləşib.*

*Rəvayətə görə, möcüzkar Miskin ocağına hər axşam bir sürü maral sağına gəlirdi. Bir gün arvadı maral südünün qan kəsdiyini*

***görüb, ərinə xəbər verdi. Şeyxanə təlaşla köks ötürdü: "Yəqin, Şadman adam öldürdü".***

***Bir az sonra gəlib çıxan oğlu Şadman yaylaqda qarətçi quldurlarla savaş zamanı bir neçəsini öldürmək məcburiyyətində qaldığını söylədi. Bunu eşidən Miskin Abdal əlindəki Şah Xətaidən hədiyyə olan əsanı qeyzlə yerə vurdu. Dağ-daş lərzəyə gəldi, zəlzələ qopdu. Əsa burum-burum oldu. O, qarşısındakı ocaqdan höyüş bir odun götürüb, qeyzlə oğlu Şadmana doğru atdı. Ağac Şadmana çatmamış yerə sancıldı. O andaca qol-budaqlı, yaşıl armud ağacına çevrildi. Bu hadisədə Şadmanın heç bir təqsiri olmasa da, müqəddəs ocaq sahibi əlini insan qanına batırmış oğlunu ömrü boyu bağışlaya bilmədi. Bu görklü möcüzənin heyrəti bu günə qədər göyçəlilərin andı kimi səslənir: "Miskinin burulan əsası haqqı!", "Miskinin yer oynadan qeyzi haqqı!", "Odunu yarpaqladan Miskin ocağı haqqı!".***

***Dünyasını dəyişərkən o, ocağı əmisi oğlu ilə ailə quran qızına vəsiyyət eləmişdi. Çünki, bu müqəddəs ocaq yalnız Tanrı dərgahında heç bir günahı olmayan pak və əməli saleh insanlara etibar edilə bilərdi.***

***Miskin Abdal törəmələri sonralar iki tayfaya – "Şadmanlı" (oğul) və "Ocaqlı" (qız) tayfalarına bölündü.***

***500 ildən artıq göyçəlilərin and və inam yeri kimi tapındığı bu müqəddəs ocaq 1988-ci ilin məlum hadisələrindən sonra Goranboy rayonunun Qaradağlı kəndinə köçürüldü.***

***"Ocaqlı" tayfasının varisi Nəsib Hüseynov xeyirxah adamların köməyi ilə bu müqəddəs ziyarətgahı yenidən bərpa eləyə bildi.***

***Miskin Abdal və onun ocağı haqqında bu gün də xalq arasında saysız-hesabsız əfsanələr, rəvayətlər dolaşmaqdadır.***

***Dərəçiçək mahalının (indiki Ermənistanın Razdan rayonu) Axundov kəndindən didərgin düşərək, Bakıya pənah gətirmiş Tapdıq kişi bu yaxınlarda bizə Miskin Abdalla bağlı maraqlı bir rəvayət söylədi:***

***– Mən bunu neçə-neçə yaşlı adamların dilindən eşitmişəm. Bizim indiki Axundov kəndinin qədim adı Miskin olub. Bu ad göyçəli Miskin Abdalla bağlıdır. Deyirlər, adı, şöhrəti dillərdə dastan olan Miskin Abdal bir gün gəlib, bizim kəndə çıxır. Onun Dərəçiçəyə***

*gəlişi əsl el şənliyinə, toya, bayrama çevrilir. Eşidib-bilənlərin hamısı onu ziyarət etmək üçün bizim kəndə axışır. Miskin Abdalın ayaqları altında saysız-hesabsız qurbanlar kəsilir.*

*Lakin bu böyük izdihamın içində onun kəramətinə şübhə edənlər də tapılır. Bu adamlar onun təbliğ etdiyi dini təriqəti qəbul etmək istəmirlər. Belə bir təklif irəli sürülür: əgər o, doğrudan da, həqiqi kəramət, inanılmış ocaq sahibidirsə, qoy, bizə də bir möcüzə göstərsin.*

*Bunu eşidən Miskin Abdal Tanrıya üz tutub, nə isə pıçıldayır. Sonra xahiş edir ki, böyük bir ocaq çatsınlar və qumral rəngli körpə bir quzu tapıb, gətirsinlər.*

*Ocaq çatılır. Alov ərşə qalxır. Miskin Abdal körpə quzunu bağrına basaraq, alovun qoynuna atılır.*

*Bir xeyli keçəndən sonra Miskin Abdal qucağında quzu alovun içindən çıxıb, camaata qarışır. Hamı heyrət içində donub qalır. Nə ona, nə də quzuya zərrə qədər də sədəmə toxunmamışdı.*

*Bu qeyri-adi möcüzənin şahidi olanlar, o cümlədən, ona şübhə ilə yanaşanlar bir nəfər kimi Miskin Abdalın önündə diz çöküb, ona səcdə eləyir, sidq ürəklə onun təbliğ elədiyi dini təriqətə iman gətirirlər.*

*Bu böyük möcüzənin baş verdiyi kənd o gündən 'Miskin" adlandırılır.*

*Miskin Abdal 1524-cü ildə böyük Azərbaycan hökmdarı, mənsub olduğu təriqətin şahı – Şeyx Heydər oğlu Şah İsmayılın vəfatından sonra sarayla birdəfəlik vidalaşaraq, doğma yurduna – Göyçə mahalının Sarıyaqub kəndinə qayıdır.*

*Dünyada hamıdan çox sevdiyi bu böyük şəxsiyyət onun şeirlərində dönə-dönə xatırlanır, böyük məhəbbətlə yad edilir:*

> *«İqlimin şahıydı Həzrət Süleyman,*
> *Ədalətə pənah idi Nuşirəvan,*
> *Şıx oğlu İsmayıl, o cənnət-məkan,*
> *Düşməz ələ o, bir yadigardı, getdi».*

*Miskin Abdal ömrünün ahıl çağlarını məktəbdarlıqla keçirir. Onun Sarıyaqubda açdığı ilk məktəb Göyçənin elm, ürfan və sənət*

*dünyasında qazandığı bütün sonrakı uğurlarda çox mülıüm və həlledici rol oynamışdır.*

*Dini təriqətin bütün mərhələlərini şərəflə adlayıb, onun ən yüksək zirvəsinə – Pir məqamına ucalan bu möhtəşəm sufi sənətkarı ömrünün son çağlarına qədər öz böyük amalından – Haqqın dərgahına qovuşmaq istəyindən yorulub-usanmamışdır.*

*Miskin Abdal təxminən 1535-ci ildə 105 yaşında vəfat etmiş, anadan olduğu Zərgərli (Sarıyaqub) kəndində dəfn olunmuşdur. Onun müqəddəs məzarını ayrı-ayrı yerlərdə axtarmaq eşqinə düşənlərə bircə şeyi xatırlatmaq istərdik. Göyçəlilər uzun illər boyu təkcə onun ocağını deyil, həm də uyuduğu məzarı özlərinin müqəddəs ziyarətgahı hesab eləmiş, əsrimizin əvvəllərində baş verən hadisələrə qədər qoruyub saxlamışdılar.*

*Sovet hakimiyyəti illərində bərpasına imkan verilməmiş, beləliklə, unudulmağa məhkum olunmuş çox müqəddəs əbədiyyət evlərindən biri də Miskin Abdalın məzarı olmuşdur. Miskin Abdalın poetik yadigarları: gözəl gəraylı, qoşma, təcnis, divani və ustadnamələri onun qevri-adi poetik istedadından xəbər verməkdədir. Azərbaycan poeziyasına və aşıq sənətinə saysız-hesabsız ölməz sənətkarlar bəxş etmiş Göyçə saz-söz mühiti özünün bu günkü qüdrəti üçün, hər şeydən əvvəl və hamıdan çox Miskin Abdala borcludur.*

*Ömrü boyu pay almayıb, pay verən dərvişlərdən olan Miskin Abdalın müqəddəs ruhu, ölməz poetik dühası bu gün də qəlbimizə, ruhumuza öz müqəddəs nurunu saçaraq, bizi mənəvi ucalığa, paklığa, saflığa, Haqqın ulu dərgahına səsləməkdədir.*

*Tarixmizin səhifələrini vərəqlədikcə aydın olur ki, saray mühitindən heç bir şair və ya başqa sənət adamı razı qalmamış, hətta, böhtanlara düçar olan Xaqanilər, Nəsimilər və Vaqiflər həbsxana künclərində nə qədər böyük məşəqqətlərlə üz-üzə qalmışlar.*

*Miskin Abdalın öz şeirlərində tez-tez xəbis və xain insanlardan giley-güzar etməsi, çox güman ki, bu motivlərlə bağlı olmuşdur. Şairin "Məni" rədifli divanisi, bu baxımdan, bir sıra mətləblərə aydınlıq gətirməkdədir:*

*«Çərxi-gərdiş yarıtmadı dövlətdən, vardan məni,*
*Min bir dərdi-əzab verib, ayırdı yardan məni.*
*Sək rəqibin fitnə-feli çəkdi məni çarmıxa,*
*Yazıq Həzrət İsa kimi asdı divardan məni.*

*Türk əcəmə, əcəm türkə zülm eləsə günahdı,*
*Hər ikisi bir kökdəndi, yaradan da Allahdı.*
*Öz elinə düşmən kəsin axır günü kütahdı,*
*Qadir Mövlam, uzaq eylə bayquşdan, sardan nıəni.*

*"Qırxlar piri" özü verib dərsimi ümman mənim,*
*Çətin girə ürəyimə ləini-şeytan mənim,*
*Seyyid Miskin Abdal mənəm, söz mənim, meydan mənim,*
*Qoruyanım, özün qoru xain dostlardan məni».*

*Qüdrətli təriqət şairi ömrünün ahıl çağlarından çox gileylənir. Bir tərəfdən, ömrünün dolanbac yollarını xatırlayıb, keçdiyi sufi ömrünün məqamları və mərtəbələri ilə iftixar duyur, qoruduğu təmiz, pak adı ilə fəxr edir, Allahın nurunun öz üzündə təcəlləsindən böyük məmnunluq duyur. O biri tərəfdən, gəlimli-gedimli dünyanın son ucu – "ölümlü" anlarını duyub-düşündükcə, içəridən qovrulub, bədbinliyə qapılır, axirət anlarını yada salır, dünyanın, dövlətin, varın puç olduğu qənaətinə gəlir. Şairin bu qəbil şeirlərində vida notları aydın duyulmaqdadır. "Gedər", "Pir idi", "Nökərdim", "Məni", "Dönərmi", "Qocalıq", "Ağlaram", "Ya Əli", "A yaz ayları", "Nədi?", "Qocalıram", "Olmusan" adlı şeirləriudə dərin küskünlük və kədər motivləri özünü daha qabarıq hiss etdirir. Bütüıı bunlara baxmayaraq, sufi şair öz əqidəsində axıra qədər sabitqədəm və dönməzdir.*

*Xatırladığımız şeirlər XV yüzillik və XVI yüzilliyin əvvəllərində aşıq şeirinin çox zəngin məzmun və fəlsəfi mündəricəyə malik olduğunu təsdiqləyir.*

*Miskin Abdalın gəraylı, qoşma, divani və təcnisləri XV-XVI yüzillər türkdilli şeirimizin nadir nümunələrindən sayıla bilər. Bu şeirlərdə zamanla səsləşən güclü təfəkkür mündəricəsi ilə yanaşı, bədii-estetik duyum, sözün daxili məntiqi, emosional təsir gücü və siqləti vardır. Rəngarəng şəriət və təriqət notları şeirin məntiqi məz-*

*mununu cilaladığı kimi, o dövr dilimizin zəngin çalarları da şeirin rəvanlığına xüsusi təravət gətirmişdir. XV yüzilliyin sonu və XVI yüzilliyin əvvəllərində xalq şeirində təcnisin çox nadir nümunəsinə rast gəldiyimiz halda, Miskin Abdal onun çox kamil nümunələrini yaratmışdır. "El ata" təcnisinin dil zənginliyinə diqqət yetirək:*

*«Yaz olanda büsatıdır dağların,*
*Ətəyində yer eləyər elata.*
*Qarı düşmən qovğa salsa üstünə,*
*Bata bilməz süvar olsa el ata.*

*Bir Allahdır ərşi-gürşü yaradan,*
*Adı çoxdur, bir adı da Yaradan.*
*Nə yaratsan Yaradana yarat, an...*
*Qorx ki, sənə qara daşı el ata.*

*Miskin Abdal, şeytan anma, nər divan an,*
*Müxənnəsə tıtacaqdır nər divan.*
*Haqqa doğru sən qoyubsan nərdivan,*
*Ona görə deyir sənə el – "Ata"!».*

*Miskin Abdalın əldə edilmiş divanilərinin zəngin məndəricəsi göstərir ki, o, kamil bilikli və dünyagörüşlü, nəcib təbiətli, olduqca xeyirxah, ruhən pak və təmiz, ağır təbiətli, sirr saxlayan, müqəddəs əməl və amallara tapınan bir insan olmuşdur. Onun dünyagörüşü və daxili mənəvi dünyası "Qoymaram", "Məni", "Narın üzə bilmərəm", "Zay olmusan", "Yol vermədim" divanilərində çox aydın şəkildə ifadə olunmuşdur. "Yol vermədim" divanisində şair deyir:*

*«Xoş bəyanlıq virdim oldu, böhtana yol vermədim,*
*Şirin süxən əndəlibəm, hədyana yol vermədim.*
*Nifrin edib, lənət dedim xainə, iblislərə,*
*Qəlbimi ayna saxladım, şeytana yol vermədim.*

*Bir bəşəri incitmədim, kəndimi şah saymadım,*
*Dostun sirrin söyləyib, dildən-dilə yaymadım,*

*Ömür  qısa, dünya əzəl, az yaşadım, doymadım.*
*Dür mətaha meydan açdım, tək cana yol vermədim.*

*Aşıq olub söz qoşanlar, söz desin sözüm kimi,*
*Miskin Abdal, məğrur istə hamını özün kimi.*
*Arifi, mətləb qananı bilirəm gözüm kimi,*
*Sinəm üstə mərd yeridi, nadana yol vermədim».*

*500 il bundan öncə el içindən çıxıb, bir əsrlik ömrünü saraylarda, səfərlərdə, müxtəlif ölkələrdə ağrılı-acılı, bəzən şirinli xoş günlərlə başa vuran Miskin Abdal dünyası əsatirlərə, rəvayətlərə bürünmüşdür. Çöllərdən maralların həyətinə gəlib, sağılması, bir badya qatıq və bir çörəklə bir ordunu doyurması, hələ bir az da artıq qalması, qəzəblənib, oğlu Şadmana atdığı çəliyin yerə batıb, göyərməsi və başqa mifik rəvayətlər bu qüdrətli şairi az qala həqiqət dünyasından uzaqlaşdırmış, qeyri-adi bir aləmə aparıb çıxarmışdır. Əlbəttə, bütün bu əfsanələr elin piranə şairinə etiqad və məhəbbətindən irəli gəlirdi.*

*"Miskin Abdal və Sənubər" dastanı şairin ömür yolundan bəhs edən məhəbbət dastanıdır. Məzmun, mündəricə və ruhundan aydın duyulur ki, "Miskin Abdal və Sənubər" dastanı xeyli sonralar, Miskin Abdalın xalq arasında dolaşan şeirləri əsasında yaradılmışdır. Ənənəvi məhəbbət dastanlarımıza xas olan xüsusiyyətlər, ata-ananın sonsuz olması, pay verən dərvişin alma verməsi, nəzir-niyazdan sonra dünyaya gələn övladın yaxşı tərbiyə-təlim və təhsil alması, yaxud ona buta verilməsi və butasının arxasınca səfərə çıxması, səfərdə baş verən hadisələr, xeyirxah və bədxah adamlarla qarşılaşması və bütün çətinlikdən sonra butasına qovuşub, vətənə dönməsi bu dastana da xasdır.*

*Dastanın girişində verilən üç qatar şeir Aşıq Ələsgərin ibrətamiz ustadnamələrindəndir. (Miskin Abdalda da belə ustadnamələr vardır). Miskin Abdal butası dalınca səfərə çıxarkən səfərə Göyçədən – Sarıyaqub kəndindən başlayır. Ən maraqlısı budur ki, dastançı öz qəhrəmanını orta əsr dastanlarında olduğu kimi Çinə, Hindistana, Misirə, Hələbə, Yəmənə aparmır. Azərbaycanın ən gözəl obalarından – Göyçə gölündən keçirib, Dərəçiçək, İrəvan, Dərələyəz,*

*Naxçıvan və Təbrizə aparır. Dastanın bir məziyyəti də budur ki, Miskin Abdalın keçib getdiyi yerlərin həm gözəl təbiəti ilə, həm də xeyirxah və qonaqpərvər adamları ilə qarşılaşırıq. Sazı, sözü sevən adamlar Miskin Abdalı və "lələ"si Uzun Qasımı hörmətlə qarşılayır. Biləndə ki, Miskin Abdal haqq aşığıdır, butası dalınca gedir, ona daha böyük ehtiram göstərir, qayıdanbaş yenə də onlara qonaq olmasını xahiş edirlər.*

*Əlbəttə, dastandakı şeirlərin hamısının Miskin Abdala məxsus olması iddiasından çox uzağıq. Heç şübhəsiz ki, bütün dastanlarda olduğu kimi, burada da şeirlərin xeyli hissəsi dastanı diizüb-qoşan, ərsəyə çatdıran sənətkarlar tərəfindən yaradılmışdır.*

*"Şah ismayıl və Miskin Abdal" dastanı öz ideya-bədii xüsusiyyətlərinə, süjet və kompozisiyasına görə eposşünaslığımızda qəbul edilmiş məlum elmi-nəzəri təsniflərə tabe olmur. Ənənəvi məhəbbət və qəhrəmanlıq dastanlarımızdan fərqli olaraq, bu dastanın süjetində real tarixi hadisələr, xalq arasında yüzilliklər boyu dolaşan əfsanələr, rəvayət və əhvalatlar dayanmaqdadır.*

*Bu və Göyçədən toplanılmış bu kimi maraqlı epos nümunələri bizdə belə bir təəssürat oyadır ki, dastanlarımız haqqında söylənilmiş mülahizələrə, aparılan elmi-nəzəri araşdırmalara, məlum ümumiləşdirmə və təsniflərə yenidən nəzər salınmasına ciddi ehtiyaclar var.*

*Göyçənin bir çox görkəmli saz-söz ustalarının söylədiyinə görə, məşhur "Aslan şah və İbrahim", eləcə də "Yetim Hüseyn" dastanları da Miskin Abdal tərəfindən yaradılmışdır.*

*Kəsəmənli aşıq Nağıdan, Cilli aşıq Yunusdan, Ardanışlı aşıq Niftalıdan, Ağbulaqlı aşıq Abbasəlidən yazıya aldığımız bu dastanların müxtəlif variantları üzərində aparılan müşahidələr bu mülahizələrin doğruluğunu təsdiq eləməkdədir.*

*Görünür, Miskin Abdalın sehrli qapısına yeni bir açar lazımdır. Bu açar isə çağdaşlarımızın əlindədir.*

*Miskin Abdal şerində bütöv bir dövrün etnoqrafik qiyafəsi ən zərif detalı, ayrıntısı ilə canlandırılır. Onun şeriyyəti bədii möcüzədir. Qırmızı mərcan taxmış "mərkus köbəsi" ala dizlik geyən, çəpgəni atlaz Göyçə gözəlinin bəyaz, al yanaqlı çöhrəsini ürbəndi gizləyir. Ala gözlü, siyah sürməli, yaşmaq altdan baxan Sənubəri, sağrı başmaqlı, üstü zər baftalı atlas güləcəli, kuşu zər tanalı Göyçəli qızı:*

*«Bürünmüsən  zər-zərbafa, altına,*
*Bəzək zinət verər xuba xatuna.*
*Sən yola çıx, ayağının altına,*
*Mən döşəyim, xalça-palaz, kilim, gəl» –*

*deyə, görümlü bir vəsflə tərənnüm edir.*

*Hər dövrün öz həqiqəti var. Lakin Miskin həqiqəti dövrana sığmır.*

*Miskin Abdal sufiliyində Tanrıya qovuşma ideyası olsa da, şeirlərində Tanrı qüdsiyyəti İnsanla sədd-hədd əzəməti səslənir. Miskin Abdal Tanrı təcəllası idi. Göy boyda ürək yiyəsi idi.*

*Onun yaradıcılığında Tanrı sirillahlarına, pünhanlığa, təsəvvürə sığmazlığa heyrət var, bu heyrətdən kiçilib, miskinləşmək var. "Görünüb-bilinənlər bilinməzlərdən çox azdır!" Tanrısından şükranlıqla qəbul etdiyi acılara ərkyana bir gileyi var:*

*«Bu Miskin Abdalın haqdı sözləri,*
*Soldu gözəllərin gül bənizləri,*
*Od-alova düçar etdin bizləri,*
*Yıxdın qullarını, bundan sənə nə?».*

*Dühanı və möhtəşəmliyi şərh və tədqiq etdikcə söz və izah kiçilir. Biz Tanrı Miskini qarşısında miskinləşirik. İlahi! Bir insanda neçə Ali keyfiyyət cəmləşirmiş?! Aşiqlik, Poeziya, Musiqi, Övliyalıq!*

*Təriqətdən ilhamlanan, yerdə ruhumuzun səs carçısı saza tapınan, xilqətdən Xaliqə yetişən Miskinimizi öyrənməyə, tədqiqə cəhd edirik. Tədqiqi özündən kiçik olaraq, tədqiq olunduqca mənası artacaq, eraları adlayacaq Miskin Abdalımız! Mahiyyəti Təzahüründən qat-qat ucada dayanan, özünü həyatda tam realizə etsə də, özündən böyük Dünyası özünə sığan, amma özü dünyaya sığmayan bu Övliyalar Övliyasının dərgahına səcdə qılır, Ruhuna dualar oxuyuruq! Çünki, Miskin Abdal Ruhu – qovuşduğu Göyçə Ruhunu Tarixdən üstün elədi!*

# G Ə R A Y L I L A R

## DÜNYA, SƏNDƏ NƏYİM QALDI...

Eşit, deyim, dünya, səndə,
Ayım, ilim, yazım qaldı.
Qövr eləyir söz sinəmdə,
Dil-dil ötən sazım qaldı.

Yar sevmişdim, yarım getdi,
Var yığmışdım, varım getdi,
Eşqim, etibarım getdi,
Ahım, ünüm, sızım qaldı.

Qayaları sökdürərdim,
Zərdən saray tikdirərdim,
Yağıları çökdürərdim,
Məndən təpər, dözüm qaldı.

Ərşə-gürşə bəlli əslim,
Yaradana ollam təslim,
Adla, sanla olan nəslim,
Bir oğlum, bir qızım qaldı.

Hər nə varsa hədər imiş,
Hər şey gəldi-gedər imiş,
Ölüm yaman betər imiş,
Yol-ərkanım, izim qaldı.

Şadman könlüm tari-mardır,
Şanda balım zəhri-mardır,
Günüm-gecəm ahu-zardır,
Şirin-şirin sözüm qaldı.

Yaşayan kim, ölən kimdir,
Ağlayan kim, gülən kimdir,

Gedən gedir, gələn kimdir,
Nə mizrabım, nə sim qaldı.

Yoxdur daha Şahənşahım,
Ərşə bülənd oldu ahım,
Adım, sanım, qibləgahım,
Haqq çağıran səsim qaldı.

Telli saza mizrab vurdum,
Məclislərdə dastan qurdum,
Neçə-neçə aşıq yordum,
Sözüm düzüm-düzüm qaldı.

Bir şəcərəm, bir kəşkülüm,
Gur ocağım, odum, külüm,
Yığın-yığın varım, mülküm,
Al-qumaşım, bezim qaldı.

Dünya puçdu, puçdu dünya,
Dünya heçdi, heçdi dünya,
Abdal, yaman keçdi dünya,
Yaşamaqda gözüm qaldı.

## QOCALIRAM

Ay dolanır, il ötüşür,
Yavaş-yavaş qocalıram.
Cavanlığım yada düşür,
Əriyir yaş, qocalıram.

Nə qədər həmdəmim vardı,
İndi mənlə qalan yardı.
Şəvə kimi telim vardı,
Çallaşır baş, qocalıram.

Heyf, ömrüm getdi bada,
Əlim çatmır dosta, yada,
"Sözüm keçmir" arvada da,
Bişməyir aş, qocalıram.

Zimistandır hər gələn yaz,
Dünya uzun, ömür nə az,
Dilimdə söz, əlimdə saz,
Gözümdə yaş qocalıram.

Miskin Abdal – bəlli adım,
Pərvazlanmır qol-qanadım,
Qayaları oynadardım,
Tərpənmir daş, qocalıram.

## NƏDİ?

Tərs düşüb fələyin işi,
Lil basan arxdımı, nədi?
Fani dünyanın gərdişi,
Dolanan çarxdımı, nədi?

Qalanıb küfrün kürəsi,
Yanırsan gözüm görəsi,
Tutulub yolun yörəsi,
Bir bilən yoxdumu, nədi?

Miskin Abdal, işin xata,
Ünün gedib, ərşə çata,
On iki ay müdam yata,
Görünən baxtdımı, nədi?

## DÖNƏR

Vətən deyib ağlayanın,
Göz yaşları selə dönər.
Axıb, gedər gecə-gündüz,
Bir məkanda gölə dönər.

Yolu yorğun dağ aşanın,
Axırı yox şöhrət-şanın,
Qürbət eldə yaşayanın,
Bir həftəsi ilə dönər.

Bir yandadır hay-haraylar,
Bir yandadır sonsuz vaylar,
Çil-çıraqlı çox saraylar,
Yanıb-yanıb külə dönər.

Mayasıdır Haqqdan halal,
Hər kəlməsi sirli sual,
Qərib olan Miskin Abdal,
Bəlkə, bir gün elə dönər.

## BAŞIN

Namərd ilə yoldaş olma,
Uzun ağrı çəkər başın,
Halallıqla ərsəyə çat,
Daş qalalar sökər başın.

Xain çıxma Yaradana,
Qibləgahdır ata-ana.
Arxalanma bəyə, xana,
Qoy sağ olsun nökər başın.

Haqdan istə bəxtı-iqbal,
Yaradanı yadına sal,
Söz gövhərdir, Miskin Abdal,
Saxla, dürdür, tökər başın.

## DÜŞƏRSƏN

İnsan oğlu, kələk qurma,
Kələyə, fəndə düşərsən.
Nahaq yerə üzə durma,
Zülmündən anda düşərsən.

Hər adamla olma tanış,
Yaz gününü eyləyər qış.
Fikir eylə, sonra danış,
Qəfil kəməndə düşərsən.

Miskin Abdal, xəbərdar ol,
Yoldaşına düz ilqar ol,
Yaman günə şükürdar ol,
Dönüb, hasanda düşərsən.

## FƏLƏK

Yıxdın könlüm şəhrini,
Dad fələk, aman fələk!
İçdim hicran zəhrini,
Zülm etdin yaman, fələk!

Qara geyibdir sazım,
Nə oxuyum, nə yazım?..
Nakam qaldı murazım,
Vermədin aman, fələk!

Zülm olmaz beyləsindən,
Qoru şər hiyləsindən,
Abdalın naləsindən
Bir diksin, oyan fələk!

## ALLAH, ÖLÜMÜN HAQDI!

Bu dünya, o dünya var,
Allah, ölümün haqdı!
Bir dirilik suyu var,
Allah, ölümün haqdı!

Axırın puçdu, dünya,
Var ikən heçdi dünya.
Hey gəldi, keçdi dünya,
Allah, ölümün haqdı!

Abdal, yastıq daş olar,
Üst torpağın yaş olar,
Mələklər yoldaş olar,
Allah, ölümün haqqdı!

# GEDİN, DEYİN LƏLƏ BƏYƏ

Gedin, deyin Lələ bəyə,
Bu naleyi-əfqanımı.
Qanlı fələk zülm elədi,
Ayırdı candan canımı.

Mən bu bağa girərəmmi?
Gül dəstəsin hörərəmmi?
Ya Rəbb, bir də görərəmmi,
Öz mürşidi-sultanımı?

Miskin Abdal, bu nə kələk?
Dövran qoymaz bizi gülək,
Yerə vurdu məni fələk,
Ucaltdıqca düşmanımı.

# YARIM

Dodaqları gül qönçəsi,
Yanaqları lala yarım.
Kölgən gələndə gün qaçar,
Sən bəlasan, bəla, yarım.

Tanrı səni var edibdi,
Aşiqini xar edibdi,
Fələkləri kar edibdi,
Çəkdiyim ah-nala, yarım.

Miskinin söhbət-sözüsən,
Cümlə gözəllər gözüsən,
''Ağrı dağı''n nərgizisən,
Bürünmüsən şala, yarım.

# BU DA MƏNİ

Ay dilbilməz, neyləmişəm,
Yandırırsan oda məni.

